









Azərbaycan Respublikası
Elm Və Təhsil Nazirliyi




Naxçıvan Dövlət
Universiteti



Azərbaycan Respublikası
Elm Və Təhsil Nazirliyi
Botanika İnstitutu




Azərbaycan Botaniklər Cəmiyyəti
İctimai Birliyi

# Biomüxtəlifliyin dayanıqlığının təmin edilməsində yeni çağırışlar (COP29)

# YAŞIL DÜNYA VƏ İNSAN SAĞLAMLIĞI

## Beynəlxalq Elmi-Praktiki Konfrans

3-4 iyun 2024
Naxçıvan şəhəri

## MÜNDƏRİCAT

## *Naxçıvan Muxtar Respublikasının bioloji müxtəlifliyinin müasir vəziyyəti və istifadə imkanları*

## *Flora və faunanın müasir vəziyyətinin təhlili*

# APİLARNİLİN – ERKƏK ARI SÜRFƏLƏRİNİN HƏLMƏŞİYİNİN ALINMASINI İSTİSNA EDƏN HALLAR

Rüstəmli Y.M.
Naxçıvan Dövlət Universiteti
E-mail: yunisrustemli@ndu.edu.az; rustamliyunis@gmail.com

Erkək arı sürfəsi – açıq və ya qapalı artım olub, onlardan erkək arılar inkişaf edir. Digər arı məhsulları ilə müqayisədə, yeni arı məhsulu hesab olunur. Alındıqdan sonra, erkək arı südcüyü və ya erkək arı sürfələrinin həlməşiyi (bundan sonra həlməşik) də adlanır.

Avropa ölkələrində "Apilarnil" adı verilən bu arıçılıq məhsulu, Rumıniyalı məşhur arıçı Nicolae Iliesu tərəfindən kəşf edildiyi üçün, onun adının baş hərfləri ilə adlandırılır. "Apilarnil" adının baş hərfləri bu sözləri ehtiva edir: api – latınca arı, lar – larva və ya sürfə, nil – Nicolae Iliesunun adı və soyadının baş hərfləridir.

Alınmış həlməşik qısa zamanda (1-1,5 saat müddətində) parçalanmaya məruz qaldığı üçün, onun istehsal, emal və saxlanma proseslərinə yüksək tələblər verilir.

Həlməşiyin alınması istisna edilən hallar təbiətinə görə müxtəlif ola bilər: bunlar xəstəliklər, zədələnmələr, arı ailəsinin vəziyyəti, yemlənmə, saxlanma qaydalarının pozulması və başqa hallarla bağlı ola bilər.

Bu hallar aşağıdakılardır:

1. Həlməşik almaq üçün istifadə edilən arı ailəsinin varroatoz, nozematoz və digər parazitar xəstəliklərin törədiciləri ilə yoluxması;
2. Çürümə xəstəlikləri və digər infeksion mənşəli xəstəliklər;
3. Mikrobioloji çirklənməyə məruz qalmış alət, avadanlıq, material, məhsul və s. istifadəsi;
4. Kiflənmiş, daşlaşmış, hər hansı möhtəviyyata bulaşmış, habelə zədələnmiş şanların istifadəsi;
5. Xəstəliklərə qarşı aparılmış baytarlıq dərman preparatlarının tətbiqindən sonra, dərman preparatlarının arı orqanizmindən və məhsullarından qalıq miqdarı ifraz olunmamış və ya təmizlənməmiş;
6. Həlməşiyin alınması prosesində erkəkləşmiş ana və işçi arıların istifadəsi;
7. Həlməşiyin erkək arıların inkişaf tsiklinin pozuntuları baş vermiş arı ailələrindən alınması;
8. Sürfələrin xəstələnməsi və ölümü ilə nəticələnən yoluxmayan xəstəliklərin olması;
9. Həlməşiyin alınması ərəfəsində arı ailələrinə verilən tənzimləyici yemlərin tərkibində arı ailəsinin inkişafına zərər verə biləcək qarışıqların və başqa yad birləşmələrin olması;
10. Dövlət standartlarında nəzərdə tutulmayan digər hallarda.

Həlməşik, yalnız sağlam arı ailələrindən alınmalıdır.

Yuxarıda göstərilən hallarla bağlı erkək arı sürfələrinin həlməşiyi alınmamalı, alınmış həlməşik isə insanlar üçün nutrisiologiyada müalicə və profilaktika məqsədilə tətbiq olunmamalıdır.